Bu kitab Azərbaycan Respublikası
Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin
DK-435/M nömrəli
razılıq məktubuna əsasən nəşr edilmişdir.

Kitabın adı: Həyatın Qayəsi
Müəllif: Ömər Mənsuroğlu
Dizayn: Hətəmov Tural

İpək Yolu Nəşriyyatı:
ISBN:978-9952-8297-2-3
Bakı - 2016




İPƏKYOLU NƏŞRİYYATI

Bakı şəhəri Səbail rayonu
Cəfərov qardaşları, 16
Tel: (+994 12) 492 32 23
Faks: (+994 12) 492 21 67
Web sayt: ipekyolunesriyyati.az
Elektron poçt: ipekyolunesriyyati@gmail.com

# MÜNDƏRİCİAT

## Ön söz

Universitetdə oxuyarkən, fəlsəfə professoru bir müəllim mühazirələrinin birində insan haqqında danışmağa başladı. Ömrü, insanı araşdırmaqla keçmişdi. İnsanı və həyatı anlamaq üçün yüzlərlə kitab oxumuş, kitablar və məqalələr qələmə almışdı. Mühazirəni bitirdikdə ona bir sual verdim. Siz Quran oxumusunuzmu? Cavabı xeyir, oldu! Üzüldüm. Həyatı, insanı araşdırmaqla keçmiş bir professor, yüzlərlə kitab oxusa da, Quran oxumamışdı və bunun təbii nəticəsi olaraq cavabsız sualları qalmışdı. Qəribədir, insan bu həyatda yaşadığı müddətcə hər şeyi dü-

şünsə də, niyə yaradıldığını düşünmür. Düşünsə də suallarının cavabını doğru yerdə axtarmır.

## Həyatın qayəsi

Dünyanın yaradılmadan əvvəlki halını düşünək. Sən yox idin... Dünya da yox idi. Sonra Yaradan dünyanı və içində də insanları yaratdı. İllər sonra sən də gəldin dünyaya. Ətrafına baxanda heyrət içərisində qalırsan. Çünki, bütün ehtiyaclarının hamısı yaradılmışdır. Orqanizmin vitaminlərə ehtiyacı var, vitaminlərə görə qidalar yaradılıb. Yuxuya ehtiyac var, yuxu yaradılıb. Danışmağa ehtiyac var, dil yaradılıb. Yeməyi çeynəməyə ehtiyac var, dişlər yaradılıb. Yeməyi həzm edəcək mədə yaradılıb. Qoxunu al-

mağa ehtiyac var, burun yaradılıb. Bütün bunları görmək üçün bir orqana ehtiyacımız var, iki göz yaradılıb. Xülasə, bunlar saymaqla bitməz. Qısacası, insanın nəyə ehtiyacı varsa hamısı yaradılıb...

Bir sual çıxır ortaya, bütün bunlar niyə yaradılıb?... Gözün qırpılmağı belə səbəbsiz olmadığı halda, kainat səbəbsiz yaradılarmı? Əlbəttə yaradılmaz. Bəs nə üçün yaradılıb? Kainat, insan üçün yaradılıb. Bəs insan niyə yaradılıb?

Biz bu dünyaya niyə gəlmişik? Bizi yaradan bir qüdrət var. Bir qələmin belə öz-özünə əmələ gələcəyini iddia etmək, iddia edənin ağılsızlığına dəlalət edir. Bəs bu möhtəşəm kainatın, göylərin, yerlərin, dağların, təbiətin və insanın öz-özünə yarandığına inanmaq, bunu iddia edənin ağılsızlığına dəlalət etmirmi?! Yaradılmış varsa deməli bir yaradan var. Və yaradan olan

Allah, bütün bu kainatı, insanı boşu-boşuna yaratmamışdır. Allahu Təala, Qurani Kərimdə, Ali-İmran surəsində belə buyurur:

**«Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində (bir-birinin ardınca gəlib-getməsində) ağıl sahibləri üçün (Allahın varlığını, qüdrətini, kamalını və əzəmətini sübut edən açıq) dəlillər vardır.».**[1]

Onun ardınca gələn ayədə isə Allah-Təala ağıl sahiblərinin bu həqiqətləri düşündükdən sonra nə deyəcəyini bizə xəbər verir:

**«O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı xatırlar, göylərin və yerin yaradılması haqqında düşünər (və deyərlər): «Ey Rəbbimiz! Sən bunları boş yerə yaratmamısan! Sən**

1 Ali İmran, 3/190.

**pak və müqəddəssən! Bizi cəhənnəm əzabından qoru!».**[2]

Bəli! Allah, bütün bunları boş yerə yaratmamışdır. Allah, bizi də bir insan olaraq sadəcə yemək, içmək və şəhvani hislərimizi təmin etmək üçün yaratmayıb. Çünkü bizə, heyvandan fərqli olaraq ağıl neməti verib. Bu səbəbdən Allah, öz kitabında ağlını istifadə etməyib həyatını sadəcə yemək, içmək və şəhvətdən ibarət görənləri heyvanlara bənzədir. Hətta heyvanın şüursuzca etdiyi hərəkətləri, şüurlu şəkildə etdiyi üçün heyvandan daha aşağı olduğunu bildirir:

**«(Ya Rəsulum!) Nəfsini özünə ilah edəni gördünmü? Onun vəkili sənmi olacaqsan? Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti (sən deyən sözü) eşidəcək və ya (ağıllı-başlı) fikirləşəcək? Onlar hey-**

2 Ali İmran, 3/191.

**van kimidirlər, bəlkə, ondan daha çox zəlalət yolundadırlar. (Heyvan heyvanlığı ilə öz mənfəətini bilib ona zərər gətirən bir işi görməz. Bunlar isə nə xeyirlərini, nə də zərərlərini anlayarlar)».**[3]

Düşünmək insanı heyvandan fərqləndirən əsas xüsusiyyətlərdən biridir. Allah bizi yaradıb. Bunu dərk etdikdən sonra belə bir sual çıxır. Bəs niyə yaradıb? Biz niyə yaşayırıq və niyə ölürük? Ölməklə həyat sona çatır, yoxsa həqiqi həyat başlayır? Bütün bu sualların cavabını biz, Allahın kitabı Quranda tapa bilərik.

3 Furqan, 25/43-44.

## Quran Allahın kəlamıdır

Biz anladıq ki, bizi bir yaradan var.  Bəs yaradan bizdən nə istəyir? Biz bu dünyadan hara gedəcəyik və bu dünyada həyatımızı necə  yaşamalıyıq?. Heyvanlar kimi qayda-qanunsuz yaşayacağıq? Təbii ki, xeyr! Sən insan olaraq yaradılmısan. Səni yaradan sənə səni niyə yaratdığını bildirməlidir. Uca Allah bunu göndərdiyi kitablar və peyğəmbərlər vasitəsiylə etmişdir.

Allah insanı yaratmış və ona doğru yolu göstərmək üçün peyğəmbərlər və kitablar göndərmişdir. Son Peyğəmbər Həzrəti Muhamməd *səllallahu aleyhi və səlləm,* son kitab isə ona endirilən Qurani-Kərimdir. Bəs Quranın Allahın kəlamı olduğunu necə isbat edə bilərik? Bunu elə Quranın özü əsrarəngiz bəlağəti və əsrlər əvvəl bir çox elmi möcüzələrdən xəbər verməsi və

bənzəri xüsuslarla isbat edir. Bu ayrı bir kitabın mövzusu olduğundan üzərində çox durmayacağıq. Ancaq bir nümunə vermək yerinə düşər: Quranda uşağın ana bətnində inkişaf mərhələlərindən bəhs olunur. Allah-Təala «Muminun» surəsində belə buyurur:

**«Sonra onu (Adəm övladını) nütfə halında möhkəm bir yerdə (ana bətnində) yerləşdirdik. Sonra nütfəni laxtalanmış qana çevirdik, sonra laxtalanmış qanı bir parça ət etdik, sonra o bir parça əti sümüklərə döndərdik, sonra sümükləri ətlə örtdük və daha sonra onu bambaşqa (yeni) bir məxluqat olaraq yaratdıq. Yaradanların ən gözəli olan Allah nə qədər (uca, nə qədər) uludur!».**[4]

Buna bənzər ayələr çoxdur.[5] Bu ayələrdə uşağın ana bətnində inkişaf mərhələlərinə

4 Muminun, 23/13-14.

5 . Həcc, 22/5; Ğafir, 40/67; Ələq, 96/2; Nəhl, 16/4 və s.

diqqət çəkilir. Qari Miller « **Misilsiz möcüzə Quran** » kitabında, Qurandakı uşağın embrioloji inkişafı haqqındakı ayələr barədə bunları yazır:

«İllər öncə Səudiyyə Ərəbistanının paytaxtı Riyadda toplaşan müsəlman alimlər Qurandakı embriologiya haqqındakı ayələr haqqında elm adamlarına müraciət etmək qərarına gəldilər. Bunun üçün Toronto Universitetindəki qeyri-müsəlman embriologiya professoru Keyt Muru seçdilər. Keyt Mur bu sahədə bir çox əsərlər qələmə alan və dünyada tanınmış alim idi. Onu Riyada dəvət edən müsəlman alimlər ona: «Quranın sənin sahənlə əlaqəli söylədikləri bunlardır. Bizə bu barədə nə deyə bilərsən? - dedilər. «Ayələr tərcümə olundu. Tədqiqatını qurtardıqdan sonra Mur, Quranda yazılanları oxuyub heyrətə gəldi və yazdığı dərs kitabındakı bəzi yerləri dəyişdirmək məcburiyyətində qaldı. O,

Qurandakı elmi kəşflərə əsaslanaraq «Biz doğulmadan əvvəl» (Before We are born) adlı kitabının ikinci çapında, embriologiya haqqındakı fəslə bəzi əlavələr elədi. Mur bir verilişdə çıxış edərkən isə belə deyirdi: «İnsan embriologiyası haqqında Quranın bəhs etdiyi xüsuslar 30 il əvvələ qədər bilinmirdi».

Murun kliniki embriologiya haqqındakı kitabı böyük səs-küyə səbəb oldu. Bir qəzet müxbiri Mura: «Qurandakı embrion təsvirini ərəblərin ta o dövrdən bildiyini deyə bilərikmi? Onlar bu məsələ haqqında bəzi ibtidai məlumatlar əldə etmiş, insanları yararaq bəzi araşdırmalar aparmış ola bilərmi?» - deyə soruşduqda Professor Mur ona gözdən qaçırdığı çox mühüm bir nöqtəni xatırlatdı. Belə ki, göstərilən bütün embrion slaydları mikroskop vasitəsiylə çəkilən şəkillər əsasında hazırlanmışdı. Mur daha sonra qeyd etdi ki, 14 əsr əvvəl

onlar bu mövzuda tədqiqat aparsalar belə embrionu görə bilməzdilər». Mikroskop isə 2 əsr əvvəl icad edilib. Deyək ki, 14 əsr əvvəl kimsə mikroskopu icad etmiş və embrionu kəşf etmişdir. Daha sonra bunu Muhamməda öyrətmiş və onu bu kəşfi kitabına qoymaq üçün razı salmışdır. Və bundan sonra kəşfin sahibi mikroskopu yox etmiş və bu kəşfini əbədi sirr kimi özündə saxlamışdır. Buna inanmaq mümkündürmü? Belə bir şeyi söyləmək çox gülünc olar. «Bu məsələnin Quranda yazıldığını necə izah edə bilərsiniz» sualına isə Mur belə cavab vermişdir: «Bu Quran Allah tərəfindən endirilən vəhydir».[6]

Quranın bu gün elm tərəfindən təsdiqlənmiş yüzlərlə möcüzəsi var. Biz sadəcə birini qeyd etdik. Bundan başqa dağlar, bal arısı, dəmirin kosmik mənşəli olması, dənizlərin suyunun bir-birinə qarışmaması,

6. Gari Miller, «Misilsiz möcüzə Quran»

barmaq izlərinin müxtəlifliyi və s. bir çox sahədə buna bənzər yüzlərlə möcüzəsi var. İstəyən bu mövzuda yazılmış müstəqil kitablara, sənədli filmlərə baxa bilər. Bütün bu elmi möcüzələr də təsdiq edir ki, Quran Allahın kitabıdır. Son dövrlər elm tərəfindən təsdiqini tapmış bu faktların VII əsrdə Ərəbistan səhralarında, bədəvilərin yaşadığı bir cəmiyyətdə, ümmi (yazıb-oxumaq bilməyən) bir insan tərəfindən bilinməsi mümkün deyil. Deməli, Quran Allahın kəlamıdır və biz suallarımızın cavabını yalnız Quranda tapa bilərik.

## Allah bizi niyə yaradıb?

Allah-Təala Qurani Kərimdə Mülk surəsində belə buyurur:

**«Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq (bəlli etmək) üçün ölümü və həyatı yaradan Odur. O, yenilməz qüvvət sahibidir, (çox) bağışlayandır».**[7]

Allah bizi öz əmr və qadağalarına nə qədər riayət edib etməyəcəyimizi imtahan eləmək üçün yaradıb. Başqa bir ayədə isə Allah-Təala belə buyurur:

**«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!».**[8]

7. Mülk, 67/2.

8. Zəriyət, 51/56.

Yaradanı tanımaq və ona ibadət etmək və yalnız ona bəndə olmaq. Çünki Allaha qul olan, bütün köləliklərdən qurtular, ona qul olmayan isə hər şeyin köləsi olar. İslamı təbliğ etmək üçün gedən səhabələrə «bizdən nə istəyirsiniz, bura nə üçün gəlmisiniz? - deyə soruşanlara; «Biz sizi qula qul olmaqdan qurtarıb, Allaha qul olmağa çağırırıq» - deyərdilər.

## Allahı tanımaq

Bu aləm, maddədən yaradılmışdır. Yəni əvvəlcə yox ikən sonradan meydana gəlmişdir. Bunu bütün alimlər qəbul edir. Əvvəlcə yox ikən sonradan yaradılan hər şey -məntiqi olaraq- bir yaradıcının varlığına möhtacdır. Bu aləm də sonradan yaradıldığına görə, bir yaradana möhtacdır. Bu yaradan da Allah-Təaladır. Hər hansı bir şeyi, misal üçün, bir masanı düşünək; masa əlbətdə öz-özünə masa şəklinə düşməmişdir.

Əvvəlcə balaca bir ağac idi, sonra ağac böyüdü. Böyüyərkən ağacın, günəşə, suya, qidaya ehtiyacı olduğunu bilirik. Daha sonra bir insan tərəfindən kəsildi. Mişarda kəsildi. Mismarları vurularaq bir masa halına gətirildi. İndi, ən sadə bir masa öz özünə düzəldilmədiyi halda üzərində növbənöv canlılar olan kainat öz-özünə yaranarmı?

Kainatı düşünək. Günəş sistemi səmada 12 milyard km məsafəni əhatə edir. Günəş özü kürə şəklində olub, dünyaya uzaqlığı isə 150 milyon kilometrdir. Günəş də eyni dünya kimi öz oxu ətrafında fırlanır. Günəşin mərkəzindəki istilik təxmini olaraq 20 milyon $C^0$- yə çatır. Bəs günəşin enerji qaynağı nədir? Günəşin özündəki enerjini təmin etmək üçün 1 stansiyanın saniyədə bir neçə milyard ton kömür yandırması lazımdır. Amma belə bir stansiya mövcud deyil. Günəş yaranandan bəri enerji itkisinə məruz qalmasına rəğmən bu günə qədər sönməmişdir. Deməli, bunu söndürməyən

bir qüvvə var. Elmin belə izahdan aciz qaldığı belə xariquladə bir hadisəni bir təsadüfə yaxud iradəsiz bir təbiətə bağlamaq mümkündürmü? Üzərimizdəki böyük bir lampa kimi olan günəşin varlığı, Allahın varlığına, sonsuz qüdrətinə qəti bir dəlil deyilmi? Dünyanın günəş ətrafında hərəkəti biraz yavaşlasa, Günəşə yaxınlaşar və yanardıq. Sürətlənsə uzaqlaşar ve donardıq. Dünyanın Günəşə olan uzaqlığı, mövcud canlıların yaşama səbəblərindən sadəcə biridir. Digər planetlərdə dünyadakı həyata bənzər bir həyatın olmamasının səbəbi budur. Eyni şərtlər eyni nəticəyə səbəb olduğundan , dünyadaki şərtlər digər planetlərdə olmadığı üçün, dünyadakına bənzər bir həyat oralarda yoxdur. Dünyanın Günəşə olan uzaqlığını kim təyin edib? Dünyaya kim bu şəkli verib? Sonra dünyanın həm öz ətrafında, həm də Günəşin ətrafında dönməsini davam etdirən kimdir? Bu hərəkəti davam etdirən kimdir? Kainata

ibrətlə baxsaq bu cür saysız hesabsız möcüzələrlə qarşılaşarıq. Bütün bunlar ağıl sahibləri üçün dəlildir ki, dünya öz özünə var olmayıb, onu yoxdan var edən bir yaradıcı var. O da Allahdır.

İnsan bədənini düşünək. Dünyada təxminən 7 milyard insan var, bu 7 milyard insanın barmaq izləri bir-birinə bənzəməməkdədir. İnsanlıq neçə milyard artsa da yenə də bir-birinə bənzəməyəcəkdir. İndi düşün! Necə olur ki, milyardlarla insanın barmaq izləri birbirinə bənzəmir? Əgər sadəcə təsadüfdür desən gülünc vəziyyətə düşmüş olarsan. Bunun təsadüf olduğunu demək, ağılsızlıq deyilmi?  Biraz ağlı olan insan, «Bunu ancaq Allah edər» deyər.

Daha əvvəldə də qeyd etdiyimiz kimi, madam bir yaradılan var, deməli onu bir yaradan var. O yaradan da Allahdır. Ya-

radanı tanımaq üçün yaratdıqlarını düşünmək lazımdır. Kainata ibrət nəzəriylə baxan insan, möhtəşəm bir sənət əsəri görür. Ancaq əfsuslar olsun ki, bəzi insanlar sənət əsərini gördüyü halda sənətkarın olduğunu inkar edirlər. İnsan bədənindəki damarların uzunluğu yer kürəsini 2,5 dəfə dövr etməyə yetir. Deməli, bu mükəmməl sistemi insan vücuduna yerləşdirən misilsiz bir qüdrət var. Bir damla spermanın içərisindəki milyonlarla spermatozoiddən mayalanan sadəcə bir hüceyrədən insana həyat verən, onu ən gözəl bir surəttə yaradan qüdrət var. Üzərimizdə dirəksiz dayanan səma, dağlar, ağaclar, güllər, hər biri yaradanın varlığına dəlalət edir. Əgər kimsə, Allahın varlığını qəbul etdiyi halda niyə gözlə görülmədiyinin hikmətini öyrənmək istəyirsə ona belə cavab verərik. Birincisi, bir şeyin gözlə görünməməsi onun var olmadığını göstərmir. Çünki gözlərimizlə görmədiyimiz ancaq hər kəsin varlığını qəbul etdiyi bir

çox şey var. Bunun hikmətinə gəldikdə isə, Allah insanı imtahan etmək üçün yaratmışdır. İnsanın yaradılış qayəsi Allaha ibadət etməklə, imtahan üçün göndərilmiş olmasıdır. Əgər, Allah gözlə görünsəydi, o zaman imtahanın mənası qalmazdı. Beləcə də Allahın əmrlərini yerinə yetirənlərlə, yetirməyənlər bilinməzdi. Və Allah-Təala Qurani-Kərimdə, müsəlmanlar haqqında: «Görmədikləri halda Allaha inanarlar" buyurur. Əsas olan görmədən inanmaqdır. Gördükdən sonra hər kəs inanar... O zaman inanmağın bir dəyəri olmazdı. Bir yaradan olaraq Allahın varlığı inancı bir insanın qəlbinə yerləşdikdən sonra bayaq verdiyimiz misallar işiğında kainatı düşünək. Biz kainata ibrətlə baxsaq kainatda möhtəşəm nizam olduğunu görərik.

Kainatda möhtəşəm bir nizam var. Bir işdə bir neçə idarəçinin olması həmin işin nizamını pozar. Kainatın idarəçisi olan

Allah təkdir. Bu Tövhid inancıdır. Allah yaradan, ruzi verən, hökm edən, sonsuz elm, güc, qüdrət sahibidir. Bütün gözəl isimlər ona aiddir və Allah bütün nöqsan sifətlərdən münəzzəhdir.

**«O, (hər şeyi) yaradan, yoxdan var edən, (hər şeyə) surət verən Allahdır. Ən gözəl adlar (əsmayi-hüsna) ancaq Ona məxsusdur. Göylərdə və yerdə nə varsa (hamısı) Onu təqdis edib şəninə təriflər deyər. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!».**[9]

**«Bu sizin Rəbbiniz, hər şeyin xaliqi olan Allahdır. Ondan başqa heç bir ilah yoxdur! Siz necə (aldanılıb haqdan) döndərilirsiniz? (Ondan necə dönürsünüz?)».**[10]

9. Həşr, 59/24.

10. Ğafir, 40/62.

## Ölüm gərçəyi

**«Hər bir kəs (hər bir canlı) ölümü dadacaqdır».**[11]

İnsan həyatda yaşadığı müddətcə çox şey haqqında düşünür. Ev, iş, ailə, ətraf və s. Təbii ki, bunlar öz yerinə görə ciddi məsələlərdir. Amma, inanan inanmayan hər kəsin qəbul etdiyi bir həqiqət var ki, insan onu düşünmək istəmir və ya düşünməkdə çətinlik çəkir. Bu ölüm həqiqətidir. Ağız dadını qaçıran, bütün ləzzətləri yox edən ölüm. Dünyada nə qədər çalışsan da, nə qədər zəngin olsan da, nə qədər ailən və ətrafın böyük olsa da, dünya ayaqlarının altına gəlsə də öləcəksən. Sahib olduqların maddi şeylərin hamısı əlindən çıxacaq, cansız bə-

11. Ənbiya, 21/35.

dənin torpağa tapşırılacaq. Bir müddət sonra unudulacaqsan. Sonra unudulduğun belə unudulacaq. Allah-Təala Qaf surəsində belə buyurur:

«Ölüm (ölüm bihuşluğu), həqiqətən, gələcəkdir. (Ey insan!) Bu sənin qorxub qaçdığın (cürbəcür vasitələrlə canını qurtarmaq istədiyin) şeydir!».[12]

Heç ölməyəcəkmiş kimi yaşadığın, dörd əllə sarıldığın dünyadan ayrılacaqsan. Bütün sevdiklərin də öləcək, səndən əvvəl və ya sonra, amma mütləq öləcəklər. Hər insanın öz həyatı haqda bitmək tükənmək bilməyən planları vardır: Universiteti bitirmək, iş sahibi olmaq, evlənmək, kimi. Amma bu planların gərçəkləşəcəyi dəqiq deyil. Buna qarşılıq olaraq ölüm isə dəqiq gərçəkləşəcək. Qəribədir ki, insan, olacağı dəqiq olmayan planlar haqda illərlə düşünər am-

12. Qaf, 50/19.

ma baş verəcəyi dəqiq olan ölüm haqqında heç bir şey düşünməz.

Allah-Təala Cümə surəsində belə buyurur:

**«(Ya Peyğəmbər!) De: "(Qorxub) qaçdığınız ölüm sizi mütləq yaxalayacaqdır. Sonra siz gizlini də, aşkarı da bilənin (Allahın) hüzuruna qaytarılacaqsınız. O da sizə (dünyada) nələr etdiyinizi (bir-bir) xəbər verəcəkdir!».**[13]

Ölüm hər yaşda gələ bilər. Heç kimin nə vaxt öləcəyi haqqında zəmanəti yoxdur. Xəstəliklər, meydana gələn fəlakətlər hər gün ölümə nə qədər yaxın olduğumuzu göstərmirmi? İnsana nəsihət olaraq ölümü düşünmək yetər. Həqiqətən hər gün həyatdan bir gün daha uzaqlaşır, qəbirə bir addım daha yaxınlaşırıq. Fərqində olsaq da olmasaq da hər gün müxtəlif ölüm

13. Cumuə, 62/8.

təhlükələri ilə qarşı-qarşıya qalırıq. Allah-Təala Vaqiə surəsində belə buyurur:

**(Can) boğaza yetişdiyi (ölüm gəlib çatdığı) zaman siz (ona) baxıb durursunuz (əlinizdən heç bir şey gəlmir). Biz ona sizdən daha yaxınıq, amma siz (bunu) görmürsünüz!.**[14]

Ölümü düşünmək insana nəsihət olaraq yetər. Bəs ölümlə hər şey bitərmi yoxsa həqiqi həyatmı başlayar?

## Ölümdən sonrakı həyat - Axirət

Bizi yaradan Allah olduğu kimi, öldürən də Allahdır. Amma təbii ki, Allah bizi əbəs yerə yaratmayıb. Necə ki Allah, gözümüzün önündə hər qış təbiəti öldürür, yaz gələndə yenidən diriltdir, eynən bunun

14. Vaqiə, 56/83-85.

kimi, ağaclardan, güllərdən daha dəyərli varlıq olaraq yaratdığı insanı da öldükdən sonra yenidən dirildəcək. Qəribədir ki, insan, təbiətin ölüb dirildiyini, torpağa düşən xırda bir meyvə toxumundan, böyük, köklü, qollu-budaqlı bir ağacın yaradıldığını gördüyü halda insanın öldükdən sonra dirildiləcəyinə inanmaq istəmir. Axirəti inkar edir. Axirəti inkar etmək isə əslində dünyanı inkar etmək deməkdir. Biz yaradan olan Allahın ədalətli olduğunu qəti olaraq bilirik. Ancaq bu dünyada çox vaxt ədalətin təcəlli etmədiyinin zalımın zalım kimi, məzlumun da məzlum kimi öldüyünün şahidi oluruq. Demək ki, ilahi ədalətin təcəlli edəcəyi bir məhkəməyə ehtiyac var. Bu isə o deməkdir ki, Allah öldükdən sonra bizi dirildib, yaşadığımız həyatın hesabını soruşacaq. Allah-Təala Quranda axirət həqiqətini bizə dəfələrlə bildirmişdir. Allah-Təala Vaqiə surəsində belə buyurur:

**«Bəs (bətnlərə) axıtdığınız nütfəyə nə deyirsiniz? Ondan (insan) yaradan sizsiniz, yoxsa Biz?!».**[15]

**«And olsun ki, siz ilk yaradılış (dünyaya necə gəldiyinizi) bilirsiniz. Elə isə (sizi yenidən diriltməyə qadir olduğumuz barədə) heç düşünmürsünüz?!».**[16]

Allah-Təala bu ayələrdə insanın yaradılışına diqqət çəkir və düşünməyə dəvət edir. Səni bir damla sperma içərisindəki milyonlarla hüceyrədən mayalanan sadəcə bir hüceyrədən yaradan Allah, öldürdükdən sonra təkrar diriltməyə qadir deyilmi?!

Ölümdən sonra baş verəcək hadisələr Quranda qısaca belə bildirilir. Allah qiyaməti qopardacaq, bütün insanlar öləcək, dünya dağıdılacaq, ikinci dəfə sura üfürüldükdən

15. Vaqiə, 56/58-59.

16. Vaqiə, 56/62.

sonra, insanlar yenidən dirildiləcək, haqq-hesab başlayacaq və insanlar bu hesaba görə əbədi olaraq cənnətə və ya cəhənnəmə gedəcək. Bu həqiqətləri tam anlamaq üçün Quranda yer alan qiyamət və axirətlə əlaqəli hissələri oxumaq lazımdır. Allahu Təala Qiyamət surəsində buyurur:

**«Məgər insan elə güman edir ki, (qiyamət günü) onun sümüklərini bir yerə yığa bilməyəcəyik?! Bəli, Biz onun barmaqlarını da (barmaq sümüklərini də, barmaqlarının uclarını da) düzəltməyə qadirik! Lakin insan (bundan sonra da) önündəkini (qiyaməti) danmaq (pis işlər görmək) istəyər. Və (istehza ilə): "Qiyamət günü nə vaxt olacaqdır?" – deyə soruşar. Göz (heyrətdən) bərələcəyi; Ay tutulacağı; Günəşlə ay birləşəcəyi (hər ikisinin qərbdən çıxacağı, nurunun gedəcəyi) zaman - Məhz o gün insan: "Qaçıb can qurtarmağa yer haradadır?"**

**– deyəcəkdir. Xeyr, (o gün) heç bir sığınacaq olmayacaqdır! O gün (ey insan!) duracaq (pənah aparılacaq) yer ancaq Rəbbinin hüzurudur! O gün insana öncə etdiyi və sonraya qoyduğu nə varsa (sağlığında dünyada gördüyü işlər və öləndən sonra qoyub getdiyi yaxşı, pis nə varsa, hamısı) xəbər veriləcəkdir! Xeyr, xeyr! Siz tez keçib gedəni (fani dünyanı) sevirsiniz. Axirəti isə tərk edirsiniz. O gün neçə-neçə üzlər sevinib güləcək, Rəblərinə baxacaqdır, O gün neçə-neçə üzlər tutulub qaralacaq, (Sahiblərinin) bel sümüklərinin (dəhşətli bir əzabla) qırılacağını anlayacaqdır! Xeyr, (can) boğaza (körpücük sümüklərinə) gəlib yetişəcəyi, "(Onu bu bəladan) kim xilas edə bilər?" – deyiləcəyi, (Can üstə olan kimsə) ayrılıq dəminin gəlib çatdığını anlayacağı, Və (ölüm qorxusundan) qıçı-qıçına dolaşacağı zaman, Aparılacağı yer Rəbbinin hüzuru olacaqdır (ey insan)!**

**Beləliklə, o (kafir Əbu Cəhl) nə (Quranı) təsdiq etdi, nə də namaz qıldı. Amma (Allah kəlamını) yalan saydı, (ondan) üz döndərdi. Sonra da özünü darta-darta ailəsinin yanına getdi. Vay sənin halına, vay! Yenə də vay sənin halına, vay! Məgər insan elə güman edir ki, o, başlı-başına (cəzasız) buraxılacaq?! Məgər o tökülən bir qətrə nütfə deyildimi?! Sonra laxtalanmış qan oldu və (Allah) onu yaradıb surət verdi (insan şəklinə saldı). Sonra da ondan biri kişi, biri qadın olmaqla iki cift (həmtay) yaratdı. Elə isə O Allah ölüləri diriltməyə qadir deyildirmi?!».**[17]

Allah-Təala Rum surəsində belə buyurur:

**«(Ya Rəsulum!) Sən Allahın rəhmətinin (yağışının) əsər-əlamətinə bax**

---

17. Qiyamə, 75/3-40.

**ki, torpağı öldükdən sonra necə dirildir. Doğrudan da, O, ölüləri dirildəndir. O (Allah) hər şeyə qadirdir!».**[18]

## Cənnət və Cəhənnəm

Allah-Təala Quranda cənnət və cəhənnəmi bizə vəsfləriylə xəbər verir. Allah-Təala Ənkəbut surəsində belə buyurur:

**«İman gətirib yaxşı işlər görənləri (ağacları) altından çaylar axan cənnət guşələrində (Cənnətin yüksək məqamlarında) sakin edəcəyik. Onlar orada əbədi qalacaqlar. (Yaxşı əməllər) edənlərin mükafatı necə də gözəldir!».**[19]

Digər bir ayədə isə Rəbbimiz belə buyurur:

**«Kafir olaraq ayələrimizi yalanlayanlar**

18. Rum, 30/50.

19. Ənkəbut, 29/58.

**isə cəhənnəmlikdirlər, onlar orada (atəş içində) əbədi qalacaqlar».**[20]

Allah-Təala Qurani-Kərimdə cənnət və cəhənnəm əhlinin xüsusiyyətlərini bizə bildirir. Məaric surəsində Rəbbimiz belə buyurur:

**«Onlar bir-birinə göstəriləcəklər (lakin bir-birini tanısalar da, özlərini tanımamazlığa vurub bir-birindən qaçacaqlar). O günün əzabından qurtarmaq üçün günahkar istərdi ki, fəda etsin (fidyə versin) öz oğullarını; Övrətini və qardaşını; (Çətin günlərdə) ona sığınacaq verən əşirətini (qohum-əqrəbasını); Və yer üzündə olanların hamısını – təki özünü (Allahın əzabından) qurtarsın! Xeyr (bu mümkün deyildir). Həqiqətən, o (Cəhənnəm) alovlu atəşdir. (Elə bir atəş ki) başın dərisini sıyırıb çıxardır (dərini**

---

20. Bəqərə, 2/39.

**sümükdən ayırır). Çağırır (o Cəhənnəm itaətdən) çıxanı, (imandan) üz döndərəni Və (mal-dövlət) yığıb saxlayanı! (Allahın payını verməyəni; acizə, yoxsula əl tutmayanı!) Həqiqətən, insan (sərvətə) çox həris (tamahkar və kəmhövsələ) yaradılmışdır! Ona bir pislik üz verdikdə fəryad qoparar. Ona bir xeyir nəsib olduqda isə xəsis olar. Namaz qılanlar istisnadır! O kəslər ki, daim namaz qılarlar; O kəslər ki, onların mallarında müəyyən bir haqq (pay) vardır Dilənən və (hər şeydən) məhrum olan (lakin abrına qısılıb dilənməyən) kimsə üçün; O kəslər ki, haqq-hesab gününü təsdiq edərlər; O kəslər ki, Rəbbinin əzabından qorxub tir-tir əsərlər; Çünki onların Rəbbinin əzabından (bu əzabın kiməsə toxunub-toxunmayacağından) arxayın olmaq olmaz; O kəslər ki, ayıb yerlərini qoruyub saxlayarlar (zina etməzlər); Övrətləri və cariyələri istisna olmaqla.**

**(Onlarla yaxınlıq etməyə görə) əsla qınanmazlar; Bundan artığını istəyənlər isə həddi aşanlardır; O kəslər ki, əmanətə xəyanət etməz, verdikləri sözü yerinə yetirərlər; O kəslər ki, düzgün şəhadət verərlər və o kəslər ki, namazlarını (layiqincə) hifz edərlər - Məhz onlar cənnətlərdə ehtiram olunacaq (əzizlənəcək) kimsələrdir!»**.[21]

Allah-Təala Müddəssir surəsində, cənnət əhlinin cəhənnəm əhlindən, cəhənnəmə girmə səbəblərini soruşacaqlarını və cəhənnəm əhlinin bu cür cavab verəcəyini bizə xəbər verir:

**«Onlar cənnətlərdədirlər; bir-birindən soruşacaqlar; Günahkarlar barəsində (və sonra həmin günahkarlara müraciət edib belə deyəcəklər): "Sizi Səqərə (Cəhənnəmə) salan nədir?" Onlar**

21. Məaric, 70/11-35.

**deyəcəklər: “Biz namaz qılanlardan deyildik; Yoxsulu da yedirtməzdik; Batilə dalanlarla birlikdə biz də dalardıq; Haqq-hesab gününü yalan sayardıq. Ölüm bizi haqlayana qədər (bu vəziyyətdə qaldıq)».**[22]

Axirətdə qurtulanlardan yəni cənnət əhlindən olmaq iman etmək və saleh əməllər işləməklə mümkündür.

## İman nədir?

İman haqqında qısaca bunları demək olar: İman, Allaha, Mələklərinə, Kitablarına, Peyğəmbərlərinə, Axirət gününə və Qədərə yəni xeyir və şərrin Allahdan olduğuna inanmaqdır. İman həmçinin Allah tərəfindən Hz. Muhammədə *səllallahu aleyhi və səlləm* endirilən hər şeyi təsdiq etməkdir.

22. Muddəssir, 74/40-47.

Bu əsasları qəbul edib, Allahın varlığını və birliyini və Hz. Muhammədin *səllallahu aleyhi və səlləm* onun rəsulu olduğuna inanan və qəlbi ilə bunu təsdiq edib, dili ilə iqrar edən islama girmiş sayılır . Başqa ifadə ilə iman məhdud qabiliyyətlərlə yaradılan insanın əzəli və əbədi bir varlığa inanmasıdır. İman yalnız Allaha qul olmaqdır. Tək ilaha qulluq, insanı digər varlıqlara kölə olmaqdan qurtarır, insanı ucaldır. İman insanı qaranlıqlardan nura çıxarır:

**«Allah (Ona) iman gətirənlərin dostudur, onları zülmətdən çıxarıb işığa tərəf yönəldər».**[23]

İman həyatı Allahın istədiyi istiqamətdə yaşamaqdır. Allah-Təala Ənam surəsində belə buyurur:

**«De: «Mənim namazım da, ibadətim də,**

23. Bəqərə, 2/257.

**həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür!».**[24]

İman, insanı dünya həyatının faniliyinə aldanmağa qoymur, axirətin əbədiliyinə yönəldir. Yəni iman edən insan dünyanın fani olduğunu bilir və dünyanın keçiciliyinə aldanmır, dünyada ağac altında dincəlib yoluna davam edən bir yolçu kimi «Allahım həqiqi həyat axirət həyatıdır» deyərək yaşayar. Bütün yaxşılıqlar imandan, bütün pisliklər də imansızlıqdan qaynaqlanır.

## Saleh əməllər

İman bir iddiadır. İddianın isə isbata ehtiyacı var. İmanın isbatı isə saleh əməllərlədir. Saleh əməllər imanın təbii nəticəsidir. Başqa sözlə, Allahın əmr və qadağalarına riayət etməkdir. Saleh əməllərin başında İslamın 5 şərti gəlir ki, bunlar «Kəlmeyi-Şəhadət gətirmək, gündə 5 vaxt

---

24. Ənam, 6/162.

namaz qılmaq, Ramazanda 1 ay oruc tutmaq, imkanı olanların zəkat verməsi və Həcc ziyarətini yerinə yetirməsidir». İbadətlərin ən böyüyü namazdır. Müsəlman, günün müxtəlif vaxtlarında, dünyaya daldığı anda, namaz vaxtı ilə Allah onu namaza, qaranlıqlardan nura çağırır. Və mömin namaza durduğu zaman, axirət düşüncəsi beyninə hakim olur. Beləcə mömin ən azı gündə 5 dəfə dünyanın keçiciliyndən axirətin əbədiliyinə yönəlir. Namazın gün ərzində 5 vaxt olma hikmətlərindən birisi budur.

Bunun xaricində də digər fərzlər və bütün xeyir əməllərə davam etmək. Həmçinin Allahın haram buyurduğu zina, içki, faiz, iftira, oğurluq kimi günahlardan da uzaq durmaq lazımdır. Əvvəldə də qeyd etdiyimiz kimi iman edib, saleh əməllər işləyənlər və bu hal üzrə ölənlər əbədi cənnət əhlidir. İnkar edənlər isə əbədi cəhənnəm əhlidir.

## İnsanlıq tarixindən həqiqi iman örnəkləri

İmanın dəyərini anlamaq üçün insanlıq tarixindən həqiqi iman örnəklərini bilmək lazımdır. Qısaca bir neçə nümunə verək. Zalımlarından biri olan Fironun xanımı **Asiyə**. Böyük bir sarayda ikinci şəxs sayılırdı. Qaşlarını oynatması belə əmr etməsi üçün yetərli idi.  Hz. Musanın *əleyhissəlam* dəvətini qəbul etdi, Allah, qəlbinə iman yerləşdirdi. Əri firon xanımının iman etdiyini anlayınca, onu işgəncəylə, öldürməklə təhdid etdi. O, dinindən dönmədi. Firon daha da hiddətləndi. Onu yerə yatırıb, əllərindən və ayaqlarından torpağa mismarlatdı. Asiyə qorxmadı. İllərlə kraliça olaraq yaşadığı sarayın həyətində işkəncə ilə öldürülərkən, etdiyi dua Qurani-Kərimin ayəsi oldu:

**«Allah iman gətirənlərə isə Fironun**

**zövcəsini (Asiyə bint Məzahimi) misal çəkdi. O zaman o: «Ey Rəbbim! Mənim üçün Öz dərgahında – Cənnətdə bir ev tik. Məni Firondan və onun əməlindən qurtar. Məni zalım qövmdən xilas et!» – demişdi».**[25]

Məşhur təfsir alimi İbn Kəsir bu ayənin təfsirində, bu ayətlə bağlı sahabədən və tabiindən gələn rəvayətləri zikr edərkən deyir ki: “ Firon Asiyəyə işgəncə edir,  O isə səbr edirdi. Asiyə cənnətdəki evini gördü. Görüncə güldü. Bunun üzərinə Firon dedi ki: “Bunun dəliliyini görürsünüzmü, Biz ona işgəncə edirik, o isə gülür.” Allah onun ruhunu cənnətə qoymaq üzərə aldı. Allah ondan razı olsun.”

Rasulullahın *səllallahu aleyhi və səlləm* sahabələrindən **Amir ibn Fuheyra**. Biri-Maunə faciəsi zaman şəhid edilmişdir. Onu

25. Təhrim, 66/11.

öldürən müşrik sonralar deyir ki: «Mən onu öldürmək üçün arxadan yaxınlaşıb nizəmi kürəyinə sapladım. O isə bu haldaykən: - «Vallahi qazandım!» deyirdi. Öz-özümə: «Nəyi qazandın ki?! Mən onu öldürmüş deyiləmmi?!» - dedim. Şahid olduğum bu hadisə müsəlman olmağıma səbəb oldu». Sahabənin son nəfəsdəki iman həyəcanı, Allah üçün canını verməyin sevinci, onu öldürəni düşündürdü və iman etməyinə səbəb oldu.[26]

Rasulullahın *səllallahu aleyhi və səlləm* sahabələrindən **Sad ibn** Rəbi. Uhud döyüşündə şəhid edilmişdir. Ölmədən öncə yanındakı sahabəyə bu sözləri dedi: " Vallahi gözləriniz qımıldadığı müddətcə, Peyğəmbəri - sallAllahu aleyhi vəsəlləm- düşmənlərindən qorumayıb başına bir müsibət gəlməsinə səbəb olsanız, Allah qatında heç bir üzürnüz olmaz. Allahın Rəsuluna de ki,

26. İbn Hişam, Siratun-Nəbəviyyə.

Mən cənnətin qoxusunu hiss edirəm».[27]

**Fironun sehrbazları**. Fironun köməkçiləri idilər. Firon onları, Musaya *əleyhissəlam* qarşı istifadə etdi. Böyük bir meydanda Allahın Peyğəmbəri ilə qarşılaşdılar. İstədikləri kimi olmadı, Peyğəmbərin möcüzəsi qarşısında məğlub oldular. Sehrbazlar həqiqəti gördülər və: **«Biz Musanın Rəbbinə iman etdik»** dedilər. Firon «Sizi bir ağaca asıb doğrayaram» deyə təhdid etdi, fikir vermədilər. Firon dediyini elədi, lakin onlar imandan dönmədilər. Səhər sehrbaz idilər. Günorta isə şəhid olaraq Allaha qovuşdular. Çünkü haqqı görən kimi iman etdilər. Allah onların bu hallarını Quranda Əraf surəsində bizə belə xəbər verir:

**«Onlar (hamı birlikdə) səcdəyə qapanıb dedilər: "Biz iman gətirdik aləmlərin Rəb-**

27. İbn Hişam, Siratun-Nəbəviyyə.

**binə - Musanın və Harunun Rəbbinə!” Firon (onlara) dedi: Əl-ayağınızı çarpaz kəsdirəcək, sonra isə hamınızı çarmıxa çəkdirəcəyəm!” (Sehrbazlar) belə cavab verdilər: “Şübhə yoxdur ki, biz Rəbbimizin hüzuruna dönəcəyik! (Bizi ölümlə qorxuda bilməzsən!) Sənin bizdən intiqam almağın isə ancaq Rəbbimizin möcüzələri gələn kimi bizim onlara iman gətirməyimizə görədir. Ey Rəbbimiz! Bizə (bolluca) səbr əta et və bizi müsəlman olaraq öldür!».**[28]

## Hz. Əlinin bir xütbəsindən qısa nəsihətlər

Hz. Əli *radiyallahu anh* Rasulullahın *səllallahu aleyhi və səlləm* ən seçkin səhabələrindən biridir. Xilafəti illərində bir gün minbərə çıxıb xütbə oxuyarkən bunları söylədi:

28. Əraf, 7/120-126.

«Ey Allahın qulları, ölümdən qurtuluş yoxdur. Əgər ona qarşı dursanız sizi yaxalayar, ondan qaçsanız belə arxanızdan gəlib sizi tutar. Qurtuluşa baxın, arxanızda sizi udmaq istəyən məzar var. Məzarın sizi sıxmasından qorxub tədbirinizi alın. Onun qaranlığına qarşı qorunun. Diqqət edin, məzar, ya cəhənnəm çuxurlarından bir çuxur, ya da cənnət bağçalarından bir bağçadır. Diqqət edin, məzar hər gün üç dəfə belə deyər: «Mən qaranlıq yurduyam, mən yalnızlıq yurduyam». Diqqət edin, bunun gerisində elə bir gün (qiyamət günü) var ki, o gündə uşaqlar yaşlanacaq, yaşlılar isə sərxoş olacaqlar. **«Onu görəcəyiniz gün hər bir əmzikli qadın əmizdirdiyi uşağını unudar, hər bir hamilə qadın bari-həmlini (vaxtından əvvəl) yerə qoyar (uşaq salar). İnsanları sərxoş görərsən, halbuki onlar sərxoş deyillər. Ancaq Allahın əzabı çox şiddətlidir!».**[29] Diqqət edin!

29. Həcc, 22/2.

Bunun da o tərəfində daha şiddətli bir yer var (cəhənnəm), oranın istiliyi dəhşətlidir. Dərinliyi çox, suyu irindir, gözətçisinin adı Malikdir ki, onda mərhəmət yoxdur».

Hz. Əli sözlərinin bu yerində ağladı, yanındakı müslümanlar da ağladılar. Sonra sözünə belə davam elədi:

«Diqqət edin, ondan o tərəfdə də cənnət var ki, genişliyi göylərlə yer genişliyi qədərdir. O, təqva sahibi kimsələr üçün hazırlanmışdır. Allah bizi və sizi təqva sahibi kimsələrdən eyləsin. Bizi və sizi o günün əzabdan qorusun».[30]

## Nəticə

İslam alimlərindən biri deyir ki: «Bir qəsəbədə hamının yalançı kimi tanıdığı birisi yaşasa, bir yerə çıxıb insanlara: «Ey insanlar bu dağın arxasından böyük bir

30. İbn Kəsir, əl-Bidayə vən-Nihayə.

düşmən qoşunu qəsəbəyə hücum etmək üçün gəlir» desə, yalançı olduğu üçün heç kəs ona inanmasa da, yenə də hamı tədbirini alar. Ancaq qəribədir ki, Allah öz kitabında, iman etməyən insanlara əbədi əzab vəd edir, doğru sözlü Allahın Rəsulu səllallahu aleyhi və səlləm bunu insanlara çatdırır, amma insanlar bu əzabı düşünüb tədbir almır, ölümü, qiyaməti, axirəti, cənnəti və cəhənnəmi düşünüb həyatını nizama salmır. Əfsuslar olsun ki, ətrafımıza baxanda insanların əksəriyyətinin bu qəflətdə olduğunu, haqdan uzaq yaşadığını görürük. Allah-Təala Qurani-Kərimdə bu həqiqətə bu cür işarə edir:

**«Əgər yer üzündə olanların çoxuna itaət etsən, onlar səni Allahın yolundan azdırarlar. Onlar ancaq zənnə uyar və ancaq yalan danışarlar!».**[31]

31. Ənam, 6/116.

Qurtuluş yalnız imanda və islamdadır. İmanımızın hansı səviyyədə olduğuna nəzər salaq. Hz. Əliyə aid edilən bir söz var: «Mən Allahı, cənnəti, cəhənnəmi, mələkləri, cinləri yəni qeyb olaraq iman etdiyimiz nə varsa hamısını gözlərimlə görsəm, imanım zərrə artmaz. Yəni gözümlə görmüş kimi inanıram. Bax bu həqiqi imandır. Ölmədən öncə saleh əməllərin, xeyirli işlərin sayını artırmaq lazımdır. Allah-Təala «Muminun» surəsində belə buyurur:

**«Nəhayət, (müşriklərdən) birinin ölümü gəlib çatdığı zaman o belə deyər: "Ey Rəbbim! Məni geri (dünyaya) qaytar! Bəlkə, (indiyə qədər) zay etdiyim ömrüm müqabilində yaxşı bir iş görüm! (Yaxud, bu günə qədər tərk etdiyim imana qayıdıb saleh bir əməl edim!) Xeyr, bu onun dediyi boş (faydasız) bir sözdür».**[32]

---

32. Muminun, 23/99-100.

Bu ayələrdə Rəbbimiz, bir inkarçının ölüm anında dünyaya təkrar dönmək üçün yalvaracağını bildirir. Amma dönüş yoxdur. Ölmədən əvvəl iman edib saleh əməllər işləmək lazımdır. Qurtuluş yolu yalnız budur. Bütün bu həqiqətləri daha yaxşı anlamaq üçün Quranı, Kainatı oxumaq, düşünmək və təfəkkür etmək lazımdır.

İman etdiyini iddia etdiyi halda, həqiqi imanı anlamayan, həyatını və ölümünü düşünməyən, ömrünü Allahın istədiyi istiqamətdə yaşamayan insanlara, Rəbbimizin Nisa surəsi 136-cı ayəsindəki bir əmrini bir daha xatırladaq:

**«Ey iman edənlər, iman edin.....»**

## İstifadə edilən Ədəbiyyat

Qurani-Kərim məalı - Z. Bünyadov və V. Məmmədəliyev (İpəkyolu Nəşriyyatı)

«Gencliyin imanını sorularla çaldılar» - Emine Şenlikoğlu (Mektub Yayınları)

«Təfəkkür» - Osman Nuri Topbaş (İpəkyolu Nəşiriyyatı)

Misilsiz Möcüzə Quran – Gary Miller (İpək Yolu nəşriyyatı)

Muhamməd Mustafa – Osman Nuri Topbaş (İpək Yolu nəşriyyatı)

Son Nəfəs – Osman Nuri Topbaş (İpək Yolu nəşriyyatı)

İşi Vaktinden Çok Olanlar 3, 4 cildlər – Nureddin Yıldız (Tahlil yayınları)

Əl-Bidayə vən-Nihayə Ebulfida İbni Kesir Ed-Demaşki (elektron versiya )

